**UOT: 338.433, 339.5**

# AZƏRBAYCANDA QABIĞI TƏMİZLƏNMİŞ MEŞƏ FINDIĞININ İXRACININ TƏŞVİQİ TƏDBİRLƏRİNİN NƏTİCƏLƏRİNİN QİYMƏTLƏNDİRİLMƏSİ

**Ramil Hüseyn, i.e.d.**

***İqtisadi İslahatların Təhlili və Kommunikasiya Mərkəzi***

***e-mail:** ramilzhuseyn@gmail.com*

***Xülasə***

*Azərbaycanda 2018-ci ildən etibarən qabığı təmizlənmiş meşə fındığına ixrac təşviqi verilməyə başlanılmış və üç il ərzində dövlət büdcəsindən bu məqsədlə 11,1 milyon manat vəsait ödənilmişdir. Bu məqalədə ölkəmizdə qabığı təmizlənmiş meşə fındığına ödənilən ixrac təşviqinin effektivlik, uyğunluq, səmərəlilik, dayanıqlılıq və təsir meyarları əsasında qiymətləndirilməsi aparılmış, bu təşviqin fındıq istehsalına və ixracına təsiri təhlil edilmişdir. Bu nəticəyə gəlinmişdir ki, qabığı təmizlənmiş meşə fındığı Azərbaycanın rəqabətqabiliyyətli məhsuludur və ona ixrac təşviqi verilmədiyi halda da 2018-2020-ci illərdə qeyri-neft sektoru üzrə ən çox ixrac olunan məhsullardan olardı.*

*Eyni zamanda qeyri-neft məhsullarının ixracının artırılmasında fındığın rolu qiymətləndirilmiş və onun ixracının genişləndirilməsi ilə bağlı müvafiq təkliflər verilmişdir.*

***Açar sözlər:** qeyri-neft ixracı, ixrac təşviqi, kənd təsərrüfatı, fındıq, qiymətləndirmə.*

## Giriş

Azərbaycan Respublikasında kənd təsərrüfatı ixracında fındıq əhəmiyyətli paya sahibdir və 2012-ci ildə 10,3 min ton qabığı təmizlənmiş meşə fındığı (HS üzrə məhsulun kodu - 080222) ixrac edilirdisə, 2021-ci ildə bu rəqəm 18 min ton olmuşdur. 2018-2020-ci illərdə qabığı təmizlənmiş meşə fındığının (bundan sonra fındıq) ixracda xüsusi çəkisinin artırılması üçün ixracatçılara ixrac təşviqi ödənilmişdir. Qeyd edək ki, 2020-ci ildə Azərbaycandan 113,6 milyon, 2021-ci ildə isə 108,8 milyon ABŞ dolları dəyərində fındıq ixrac edilmişdir [4; 21; 22]. Fındıq ixracı 2020-ci ilə nisbətən 2021-ci ildə dəyər baxımından 4,3 faiz azalmış, həcm baxımından isə 2,3 faiz artmışdır. 2020-ci ildə fındıq ixracı qeyri-neft ixracının 6,1 faizini, 2021-ci ildə isə 4 faizini təşkil etmişdir. Fındıq ixracının dəyər baxımdan azalmasının əsas səbəblərindən biri 2021-ci ildə dünya bazarında bu məhsulun qiymətində baş verən ucuzlaşma olmuşdur. 2018-2020-ci illərdə fındığa ödənilən ixrac təşviqinin bu məhsulun ixracına təsiri ilə bağlı qiymətləndirmə aparılmadığı üçün bu məqalədə OECD DAC (The

Organisation for Economic Co-operation and Development, Development Assistance Committee - İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatının İnkişafa Yardım Komitəsi) meyarlarından [14] da istifadə olunaraq müvafiq qiymətləndirmə həyata keçirilmişdir[1].

Məqalədə ixrac təşviqi ilə bağlı həyata keçirilən tədbirlərin nəticələrinin sistemli və obyektiv ölçülməsinə çalışılmış, qarşıya qoyulmuş məqsədlərə nail olunması səviyyəsi müəyyən edilmiş, ixrac təşviqinin effektivlik, uyğunluq, səmərəlilik, təsir və dayanıqlılıq meyarları əsasında qiymətləndirilməsi aparılmışdır. Həmçinin fındıq ixracının artırılması üçün növbəti mərhələdə təşviqin davam etdirilib-etdirilməməsi məsələsi araşdırılmış, fındıq emalının dərinləşdirilməsi ilə bağlı təkliflər formalaşdırılmışdır.

**Azərbaycanda qeyri-neft ixrac təşviqinin tətbiqi**

Azərbaycanda qeyri-neft-qaz məhsulları ixracının təşviqi məsələsi uzun müddət müzakirə mövzusu olsa da, ölkənin Ümumdünya Ticarət Təşkilatına (ÜTT) üzvlük perspektivləri nəzərə alınaraq reallaşdırılmırdı. Hətta 2004-cü ildə qəbul olunan dövlət proqramında [3] fermerlər tərəfindən yetişdirilən məhsulların xarici bazarlarda satışına dövlət tərəfindən hərtərəfli dəstəyin göstərilməsi üçün İxraca Yardım Fondunun yaradılması nəzərdə tutulsa da, sonrakı mərhələdə ÜTT-yə üzvlük məsələləri nəzərə alınaraq bu sahədə planlar dəyişmiş [12], Azərbaycanda 2015-ci ilə kimi ixraca təşviq vermək məsələsi aktual olmamışdır. 2015-ci ildə ölkədə ÜDM-in artım tempinin zəifləməsi və 2016-cı ildə azalmanın olacağı ilə bağlı proqnozlar qeyri-neft sektorunun inkişafının dəstəklənməsi yönündəki tədbirləri aktuallaşdırmış və qeyri-neft ixracının təşviqi məsələsini yenidən gündəmə gətirmişdir. Azərbaycan Prezidentinin 2016-cı il 18 yanvar tarixli Sərəncamında [18] kənd təsərrüfatı və emalı məhsullarına ixracla bağlı geriödəmə dəstəklərinin verilməsi mexanizminin yaradılması Nazirlər Kabinetinə tapşırılmışdır. Prezidentin 2016-cı il 1 mart tarixli Fərmanı [7] isə 2016-cı il martın 1-dən 2020-ci il dekabrın 31-dək ixrac təşviqinin verilməsinin reallaşdırılması üçün əsas olmuşdur. Belə ki, sözügedən Fərmana əsasən, 2020-ci il dekabrın 31-dək Azərbaycan mənşəli qeyri-neft məhsullarına dövlət büdcəsinin vəsaiti hesabına ixrac təşviqi ödənilmişdir.

İxrac təşviqinin ödənilməsi Nazirlər Kabinetinin 2016-cı il 6 oktyabr tarixli Qərarı [9] ilə təsdiqlənən qaydalar üzrə həyata keçirilmişdir. Qaydalara əsasən, ixrac təşviqinin baza məbləği ixrac əməliyyatlarına görə faktiki ixrac olunmuş malın ixrac gömrük bəyannaməsində nəzərdə tutulan gömrük dəyərinin 3 faizini təşkil edir. Lakin ixrac təşviqi ödənilən qeyri-neft məhsullarına 1, 1,5 və 2 əmsallar tətbiq edilmiş və ixrac gömrük bəyannaməsində nəzərdə tutulan gömrük dəyərinin 3, 4,5 və 6 faizi qədər ixrac təşviqi ödənilmişdir. Qeyd edək ki, 2016 və 2017-ci illərdə ixrac təşviqi ödənilən məhsullar içərisində qabığı təmizlənmiş meşə fındığı olmamışdır. Bu müddətdə ancaq qovrulmuş fındıq ləpəsinə ixrac təşviqi verilmişdir [6]. Nazirlər Kabinetinin 2018-ci il 25 iyun tarixli Qərarı ilə

[1] Qeyd edək ki, Azərbaycandan qabıqlı meşə fındığının (HS kodu - 080221) da ixracı həyata keçirilir. Qabıqlı meşə fındığı ixracının dəyəri 2012-ci ildə 152 min ABŞ dolları (72 ton) təşkil etmişdir. 2021-ci ildə isə qabıqlı meşə fındığının ixracı 2012-ci illə müqayisədə dəyər ifadəsində 20 dəfə artaraq 3 milyon ABŞ dolları (1121 ton) olmuşdur. Amma bu artıma baxmayaraq qabıqlı meşə fındığının ixracı kənd təsərrüfatı ixracında cüzi paya sahibdir və ixrac təşviqi ona şamil olunmamışdır. Eyni zamanda Azərbaycandan başqa üsulla hazırlanmış və ya konservləşdirilmiş digər qoz və fındıqlar (HS kodu - 200819) da ixrac olunur. Qovrulmuş və ya ağardılmış fındıq ləpəsi kimi tanıdığımız bu məhsula isə ixrac təşviqi verilmişdir. Lakin sözügedən məhsul da kənd təsərrüfatı ixracında az paya sahibdir. Qeyd edilənləri nəzərə alaraq bu məqalədə ancaq qabığı təmizlənmiş meşə fındığına (HS kodu - 080222) fokuslanılmış və ona verilən ixrac təşviqinin qiymətləndirilməsi aparılmışdır.

[19] ixrac təşviqi verilən malların siyahısı genişləndirilmiş, qabığı təmizlənmiş meşə fındığı bu siyahıya əlavə edilmiş və ona 1 əmsalı üzrə (yəni ixrac gömrük bəyannaməsində nəzərdə tutulan gömrük dəyərinin 3 faizi qədər) ixrac təşviqi ödənilməyə başlanılmışdır.

İxrac təşviqi ödənilən qeyri-neft məhsullarının strukturuna nəzər saldıqda isə aydın olur ki, fındıq, təzə xurma, təzə nar, üzüm şərabları və digər spirtli içkilər təşviq alan əsas məhsullar olmuşdur.

**Şəkil. 2016-2020-ci illərdə qeyri-neft məhsulları üzrə ödənilən ixrac təşviqi vəsaitinin strukturu, faizlə**




***Mənbə:*** *[25]*

Məlumat üçün bildirək ki, qabığı təmizlənmiş meşə fındığı üçün 2018-2020-ci illərdə 11,1 milyon manat təşviq ödənilmişdir [25]. Həmçinin bundan əlavə, qovrulmuş (ağardılmış) fındıq ləpəsi üçün də 814,3 min manat ixrac təşviqi ödənilmişdir. Bir nüansı qeyd edək ki, Nazirlər Kabinetinin 25 iyun 2018-ci il tarixli Qərarı ilə qabığı təmizlənmiş meşə fındığı ixrac təşviqi alacaq malların siyahısına daxil edilmiş və bu qərardan sonrakı 2 il 6 ay müddətində ən çox təşviq məhz bu məhsula verilmişdir.

## Fındıq ixracının mövcud vəziyyəti

2020-ci ildə Azərbaycandan 1851,3 milyon, 2021-ci ildə isə 2713,4 milyon ABŞ dolları dəyərində qeyri-neft məhsulları ixrac edilmişdir [21] *(Qeyri-neft sektoru üzrə ixracın dəyəri hesablanarkən 2709-2715 mal mövqeləri nəzərə alınmamışdır).* 2021-ci ildə qeyri-neft-qaz məhsullarının ixracı əvvəlki illə müqayisədə faktiki qiymətlərlə 47,2 faiz, real ifadədə 38,4 faiz artmışdır. Kənd təsərrüfatı məhsullarının ixracı isə 2020-ci illə nisbətən 2021-ci ildə dəyər baxımından 15,1 faiz artmışdır. 2021-ci ildə qeyri-neft-qaz məhsullarının ixracının 32,3 faizi kənd təsərrüfatı məhsullarının payına düşmüşdür. Qabığı təmizlənmiş meşə fındığının ixracı 2020-ci ildə qeyri-neft ixracının 6,1 faizini, 2021-ci ildə isə 4 faizini təşkil etmişdir.

**Qrafik 1. Azərbaycandan qeyri-neft məhsullarının ixracı, milyon ABŞ dolları ilə**




***Mənbə:*** *[4; 11; 21; 22]*

Fındığın ixracının dəyər baxımından 2021-ci ildə azalması dünya bazarında bu məhsulun qiymətində baş verən ucuzlaşma ilə bağlı olmuşdur. Ümumilikdə isə Azərbaycan Respublikasında kənd təsərrüfatı ixracında meşə fındığı əhəmiyyətli paya sahibdir. 2021-ci ildə 108,8 milyon ABŞ dolları dəyərində qabığı təmizlənmiş meşə fındığı ixrac edilmişdir ki, bu da kənd təsərrüfatı ixracının 12 faizini təşkil etmişdir.

Qlobal miqyasda qabığı təmizlənmiş meşə fındığı ixracına nəzər saldıqda aydın olur ki, burada həlledici paya Türkiyə Respublikası sahibdir. 2020-ci ildə dünya üzrə fındıq ixracının strukturunu təhlil etsək, görərik ki, Türkiyə 59 faizlik payla birinci, İtaliya 12 faizlik payla ikinci, Çili 8 faizlik payla üçüncü, Azərbaycan isə 6 faizlik payla dördüncü yerdədir [23].

**Qrafik 2. 2020-ci ildə dünya üzrə fındıq ləpəsi (HS üzrə məhsulun kodu - 080222) ixracının strukturu, faizlə**




***Mənbə:*** *[23]*

Qrafik 2-dən qlobal miqyasda fındıq bazarının əsas oyunçuları görünür və aydın olur ki, Azərbaycan ilk beşlikdə təmsil olunur. Bu isə həm də onu göstərir ki, hətta ixrac təşviq verilməsə də, ölkəmizdən bu məhsulun ixracı davam edəcəkdir.

Təhlilimiz göstərir ki, qabığı təmizlənmiş meşə fındığı son 5 ildə (2017-2021-ci illər) Azərbaycanda qeyri-neft sektoru üzrə ən çox ixrac olunan 5 məhsuldan biri olmuşdur. Belə ki, 2017-ci ildə 114,5 milyon, 2018-ci ildə 93,5 milyon, 2019-cu ildə 124,2 milyon, 2020-ci ildə 113,6 milyon, 2021-ci ildə isə 109 milyon ABŞ dolları dəyərində qabığı təmizlənmiş meşə fındığı ixrac olunmuşdur.

**Qrafik 3. 2017-2021-ci illərdə Azərbaycandan qabığı təmizlənmiş meşə fındığı ixracı**




***Mənbə:*** *[4; 21; 22; 23]*

Azərbaycanın 2020-ci ildə fındıq ixracının dəyər baxımından 44,4 faizi Rusiyanın, 25,4 faizi İtaliyanın, 13,4 faizi Almaniyanın, 8,1 faizi Çex Respublikasının payına düşüb [23].

Ölkədən ixrac olunan fındığın qiymətini təhlil etdikdə isə məlum olur ki, 2015-ci ildən etibarən qiymətdə azalma baş vermişdir [10]. 2015-ci illə müqayisədə 2021-ci ildə ixrac edilən 1 kq fındığın orta qiyməti 25,4 faiz və ya 1,5 ABŞ dolları azalmışdır.

**Qrafik 4. Azərbaycandan ixrac olunan qabığı təmizlənmiş meşə fındığının 1 kq-nın qiymətinin dəyişməsi, ABŞ dolları ilə**




***Mənbə:*** *[4; 21]*

Qrafik 4-dən göründüyü kimi, son 7 ildə (2015-2021-ci illər) fındığın ən ucuz ixrac edildiyi il 2018-ci il olmuşdur. Belə ki, 2017-ci illə müqayisədə 2018-ci ildə qabığı təmizlənmiş meşə fındığının ixracı dəyər baxımından 18 faiz, həcm baxımından 12,5 faiz azalmışdır. Məhz 2018-ci ildə - 2017-ci illə müqayisədə fındıq istehsalının 14,5 faiz artdığı bir vaxtda ixracın azalması dünya bazarındakı fındıq qiymətlərinin ucuz olması ilə bağlı idi. Ona görə sahibkarların bir hissəsi 2018-ci ildə əldə etdikləri məhsulları saxlayaraq 2019-cu ildə ixrac etməyi üstün tutmuşdurlar. 2019-cu ilin birinci yarısında Azərbaycandan 67,9 milyon ABŞ dolları dəyərində 12,2 min ton qabığı təmizlənmiş meşə fındığının ixrac edilməsi də bunu göstərir. Yəni 2018-ci ilin məhsulunun bir hissəsi nisbətən baha qiymətə 2019-cu ildə reallaşdırılmışdır. Bu faktın doğruluğunu 2018-ci ilin birinci yarısında Azərbaycandan 36,1 milyon ABŞ dolları dəyərində 6,7 min ton fındığın ixrac edilməsi də təsdiqləyir. Yəni 2018-ci ildə ixrac üçün nəzərdə tutulan təxminən 30 milyon dollarlıq fındıq ləpəsi 2019-cu ildə ixraca yönəldilmişdir. Bunu daha əhatəli qeyd etməkdə məqsədimiz Nazirlər Kabinetinin 2018-ci ildə qabığı təmizlənmiş meşə fındığına ixrac təşviqi verilməsi ilə bağlı qərar qəbul edərkən mövcud olan şərait barədə dolğun təəssürat yaratmaqdan ibarətdir. Buradan anlaşılır ki, 2018-ci ildə qabığı təmizlənmiş meşə fındığı ixracatçılarına təşviq verməkdə bir məqsəd də daha çox qlobal miqyasda qiymətin ucuzlaşmasından yaranan zərəri minimallaşdırmaq olmuşdur. Digər tərəfdən yuxarıda qeyd edilənlər 2018-ci illə müqayisədə 2019-cu ildə fındığın ixracının dəyər baxımından 32,8 faiz, həcm baxımından 20,9 faiz artmasının səbəbini izah edir. 2019-cu ildə ölkədə fındıq istehsalının cəmi 3,3 faiz artmasına baxmayaraq ixracın bu şəkildə artması da məhz 2018-ci ildən anbarlarda saxlanılan məhsulun hesabına olmuşdur. Başqa sözlə, bu artımın ixrac təşviqi ilə birbaşa əlaqəsi yoxdur. Həmçinin 2020-ci ildə 2019-cu illə müqayisədə qabığı təmizlənmiş meşə fındığının ixracının dəyər baxımından 8,5 faiz, həcm baxımından 18,6 faiz azalmasının da səbəbini buradan çıxış edərək müəyyənləşdirmək mümkündür.

**Qrafik 5. 2018-2020-ci illərdə Azərbaycandan ixrac olunan qabığı təmizlənmiş meşə fındığının ixrac dəyəri və ona verilən ixrac təşviqi, milyon ABŞ dolları ilə**




***Mənbə:*** *[4; 21; 25]*

Qrafik 5-dən göründüyü kimi, qabığı təmizlənmiş meşə fındığının ixrac dəyərinin 2018-ci ildə 0,8 faizi, 2019-cu ildə 2 faizi və 2020-ci ildə 2,9 faizi miqdarında ixrac təşviqi ödənilmişdir. Nəzərə alaq ki, qabığı təmizlənmiş meşə fındığı ixracatçılarına gömrük bəyannaməsində nəzərdə tutulan

gömrük dəyərinin 3 faizi qədər ixrac təşviqi ödənilə bilər. Amma verilən ixrac təşviqi ilə ümumi qabığı təmizlənmiş meşə fındığının ixrac dəyərini müqayisə edəndə ödənişlərin 3 faizdən az olduğunu görürük. Xüsusən də 2018-ci ildə fərq daha böyükdür. Düzdür, 2018-ci ildəki fərqi qabığı təmizlənmiş meşə fındığının ixrac təşviqinin ilin ikinci yarısından verilməyə başlaması ilə əlaqələndirmək olar. Ancaq burada da diqqətə almalıyıq ki, 2018-ci ilin ikinci yarısında 57,4 milyon dollarlıq fındıq ixrac olunmuşdur və verilən təşviqi bunun 1,4 faizini təşkil edir. Bu isə belə bir qənaət yaradır ki, 2018-ci ildə fındıq ixracatçılarının yarısı təşviq üçün müraciət etməmişdir. 2019-cu ildə isə ixracatçılar təşviqi almağa daha çox maraq göstərmişlər və 2020-ci ildə demək olar ki, ixracatçıların mütləq əksəriyyəti təşviq almışdırlar.

**Qabığı təmizlənmiş meşə fındığına verilən ixrac təşviqinin qiymətləndirilməsi**

Fındığa verilən ixrac təşviqini qiymətləndirməkdə məqsədimiz tamamlanmış bu tədbirin nəticələrini sistematik və obyektiv qaydada öyrənməkdir. Bildiyimiz kimi, qiymətləndirmə həm də öyrənilən təcrübənin qərar qəbuletmə prosesinə daxil edilməsinə imkan verən etibarlı və faydalı məlumatları təmin etmək məqsədi daşıyır [15]. Bizim məqsədimiz isə həm də fındığa verilən ixrac təşviqi ilə bağlı təcrübədən çıxış edərək gələcəkdə bu tip tədbirlərin icrasına töhfə verməkdir.

OECD/DAC qiymətləndirmədə ilk olaraq effektivlik, uyğunluq, səmərəlilik, təsir və dayanıqlılıq meyarlarını əsas götürürdü [14]. Daha sonra isə bu meyarların sayı altıya çatdırıldı və onlardan istifadə üçün iki prinsip müəyyən edildi. Bu meyarlardan istifadə etməklə strategiyaların, proqramların, layihə və ya tədbirlərin icrasının qiymətləndirilməsi həyat keçirilir. Fındığa verilən ixrac təşviqi ilə bağlı həyata keçirilən təşviq tədbirlərini də bu meyarlara uyğun olaraq qiymətləndirmək mümkündür. Biz araşdırmada OECD/DAC-ın 5 qiymətləndirmə meyarından istifadə etmişik[2] və onların izahı aşağıdakı kimidir:

**Effektivlik:** İxrac təşviqinin verilməsi zamanı nəzərdə tutulmuş hədəf və məqsədlərə nə dərəcədə nail olunduğunu, hansı dəyişikliklərə/təsirlərə *(müsbət və ya mənfi, planlaşdırılmış və ya gözlənilməyən)* səbəb olduğunu qiymətləndirir. Bu zaman məntiq xəritəsi, proseslər və təsiredici amillər təhlil edilir. Burada nəzərdə tutulmuş tədbirlər və ilkin nəticələr məqsədləri (aralıq nəticələri) reallaşdırmışdırsa, təşviq proqramı effektiv hesab edilir.

**Uyğunluq:** İxrac təşviqinin verilməsinin məqsədlərinin (aralıq nəticələrinin) müvafiq hədəf qrupların prioritetlərinə uyğunluq dərəcəsini, hədəf qrupu üzrə həyata keçirilmiş tədbirlərin və əldə edilmiş ilkin nəticələrin faydalılığını qiymətləndirir.

**Səmərəlilik:** Tədbirlərin icrasını, ilkin nəticələrin əldə olunmasını, məqsədlərə/aralıq nəticələrə nail olunması üçün insan və maliyyə resurslarından səmərəli istifadə səviyyəsini qiymətləndirir. Eyni zamanda icra prosesinin inzibati təşkilini, əldə olunmuş nəticələrin sərf edilmiş xərcləri doğrultduğunu təhlil edir.

**Dayanıqlılıq:** İxrac təşviqinin verilməsi ilə bağlı tədbirlərin icrası nəticəsində əldə edilən fayda və nəticələrin gələcəkdə davam etməsi ehtimalını təhlil edir.

---

[2] Qeyd edilən 5 meyar bizim qiymətləndirmə üçün kifayət etdiyindən son illər həyata keçirilən tədbirin ardıcıllığı və uyğunluğu baxımında istifadə olunan 6-cı meyarın - ardıcıllığın (Coherence) bu araşdırmada tətbiqinə zərurət görmədik. Eyni zamanda bu meyarların hər biri üzrə müvafiq qiymətləndirmə sualları hazırlanmış və cavablandırılmışdır. Məqalənin həcmi və oxunaqlığı nəzərə alınaraq aşağıdakı Cədvəldə qısaca olaraq ancaq sualların cavabları təqdim olunur.

**<u>Təsir:</u>** İxrac təşviqinin verilməsi və bu sahədəki dövlət dəstəyi fındıq ixracında hansı fərqi yaradır sualına cavab axtarılarkən bu meyar çərçivəsində həyata keçirilən tədbirin sosial, ekoloji və iqtisadi təsirlərinin müəyyən olunmasına çalışılmışdır.

Bu meyarlara uyğun olaraq qiymətləndirmənin məntiq xəritəsi hazırlanmış və qiymətləndirmə suallarının cavabları müəyyənləşdirilmişdir. Qiymətləndirmənin nəticələri aşağıdakı cədvəldə verilmişdir.

**Cədvəl. Fındığa verilən ixrac təşviqinin OECD/DAC metodologiyası ilə qiymətləndirilməsi**

| Qiymətləndirmə meyarı | Qiymətləndirmənin nəticələri |
|---|---|
| **Effektivlik** | Fındığa ixrac təşviqi verilərkən onun ixracının artması hədəflənmişdir. Amma təşviq verilməzdən öncəki il, yəni 2017-ci ildə 114,5 milyon ABŞ dolları dəyərində 20,8 min ton fındıq ixrac olunmuşdur. Təşviq başa çatandan sonrakı il, yəni 2021-ci ildə 109 milyon ABŞ dolları dəyərində 18 min ton fındıq ixracı reallaşdırılmışdır. Dövlət büdcəsindən fındığa verilən 11,1 milyon manat təşviq vəsaiti ixracın artmasında rol oynamamışdır. Yeni tendensiyalar və yeniliklər kifayət qədər nəzərə alınmamışdır. İxrac təşviqi verilmədiyi halda da 2018-2020-ci illərdə Azərbaycandan Qrafik 3-də göstərilən həcmdə və dəyərdə fındıq ixracı reallaşdırıla bilərdi. |
| **Uyğunluq** | Fındıq Azərbaycanın rəqabətqabiliyyətli məhsuludur və Daxili Resurs Xərcləri (DRC) əmsalı vahiddən çox kiçikdir. Bu isə onu göstərir ki, bu məhsula ixrac təşviqi verilmədiyi halda da 2018-2020-ci illərdə qeyri-neft sektoru üzrə ən çox ixrac olunan məhsullardan biri olacaqdı. Fındığa ixrac təşviqi verilməsi ilk baxışda ixracı artırmaq üçün uyğun tədbirdir, planlaşdırılmış qaydada icra edilmişdir. |
| **Səmərəlilik** | 2018-ci ildən etibarən ixrac təşviqi fındığa da şamil olunmuş və 2020-ci ilin 31 dekabr tarixinə kimi bu məhsulun ixracatçılarına dövlət büdcəsindən 11,1 milyon manat təşviq ödənilmişdir. Lakin resurslardan tam səmərəli istifadə edilməmiş, tədbirlərin icrası 1-ci və 2-ci ildə fındıq ixracatçılarını tam əhatə etməmişdir. Belə ki, 2018-ci ildə fındığın ixrac dəyərinin 0,8 faizi, 2019-cu ildə 2 faizi və 2020-ci ildə 2,9 faizi miqdarında ixrac təşviqi ödənilmişdir. Bu isə belə bir qənaət yaradır ki, 2018-ci ildə fındıq ixracatçıların yarısı təşviq üçün müraciət etməmişdir. 2019-cu ildə isə ixracatçıların təşviq almağa marağı artmış, ancaq təşviqin verildiyi sonuncu ildə - yəni 2020-ci ildə ixracatçılar əsasən ondan faydalana bilmişlər. Ümumilikdə isə bu tədbirin fındıq ixracının dayanıqlı artımına təsiri olmamış və əldə olunmuş nəticələr sərf edilmiş xərcləri doğrultmamışdır. Fındıq ixracına verilən təşviq həm də hədəf qruplarının ehtiyaclarını tam ödəməmişdir. |
| **Dayanıqlılıq** | 2019-cu illə müqayisədə 2020-ci ildə fındıq ixracının dəyəri 9,3 faiz azalaraq 113,6 milyon ABŞ dolları olmuş, 2021-ci ildə də bu azalma davam etmişdir. Ümumiyyətlə 2017-ci illə müqayisədə 2021-ci ildə fındıq ixracı dəyər baxımından 5 faiz, həcm baxımından 15,5 faiz azalmışdır. Nəticədə bu tədbirin dayanıqlılığı təmin olunmamışdır. 2020-ci ildən sonra bu tədbirlər genişləndirilməmiş və dayandırılmışdır. |
| **Təsir** | Həyata keçirilən tədbir 2018-2020-ci illərdə və ondan sonrakı ildə fındıq ixracının artmasına təsir göstərməmişdir. Sosial, ekoloji və iqtisadi təsirlərinə gəlincə isə sadəcə olaraq 2018-ci ildə qlobal miqyasda fındığın qiymətinin ucuzlaşdığı zaman ixracatçıların zərərinin azalmasına cüzi təsir etmişdir. |

***Mənbə:** Müəllif tərəfindən hazırlanmışdır.*

Fındıq ixracına verilən təşviqi qiymətləndirərkən gəlinən nəticə ondan ibarətdir ki, 2 il 6 aylıq müddət çox az olmuş və bu müddətdə verilən təşviq sözügedən məhsulun ixracına ciddi təsir göstərə bilməmişdir. Hətta rəqəmlərə baxılsa, təşviq verilməzdən öncəki il (2017-ci il) bu məhsulun ixrac dəyəri 114,5 milyon ABŞ dolları olduğu halda təşviq verilməyə başladığı 2018-ci ildə ixrac dəyəri 93,5 milyon ABŞ dollarına düşmüşdür. 2019-cu ildə fındığın ixracı kəskin artsa da, ən çox təşviqin verildiyi 2020-ci ildə ixrac azalaraq dəyəri 113,6 milyon ABŞ dolları olmuşdur. Ölkəmizdə fındığa ödənilən ixrac təşviqinin effektivlik, uyğunluq, səmərəlilik, dayanıqlılıq və təsir meyarları əsasında qiymətləndirməsi göstərir ki, bu məqsədlə sərf edilən 11,1 milyon manat vəsait ixracın artmasında rol oynamamışdır. Fındığa verilən ixrac təşviqinin əsas rolu 2018-ci ildə ixracatçıların xarici bazarlarda qiymət ucuzlaşması səbəbindən üzləşdikləri zərəri azaltmaq olmuşdur. Fındığın ixrac təşviqi alan malların siyahısına daxil edilməsi bu məhsulun ixracının və istehsalının artırılması baxımından hədəflərə tam nail olmamışdır. Bu sahədə aparılan bir çox araşdırma da [10; 11; 13; 16; 17] göstərir ki, fındıq Azərbaycanın rəqabətqabiliyyətli məhsuludur, Daxili Resurs Xərcləri əmsalı vahiddən çox kiçikdir və ona ixrac təşviqi verilmədiyi halda da 2018-2020-ci illərdə qeyri-neft sektoru üzrə ən çox ixrac olunan məhsullardan biri olacaqdı.

Fındığın istehsalının və ixracının artmasında ölkəmizdə həyata keçirilən digər dəstək tədbirləri daha effektli olacaqdır.

### Azərbaycanda fındıqçılığın gələcək inkişafının stimullaşdırılması

Azərbaycan Respublikasında fındıqçılığın inkişafı 2016-cı ildən etibarən dövlət tərəfindən daha intensiv dəstəklənir və fındıq bağlarının sahəsinin genişləndirilməsi istiqamətində müxtəlif tədbirlər həyata keçirilir. Bu məsələ Strateji Yol Xəritəsində [1] və Dövlət Proqramında [2] əksini tapmışdır. Prezident İlham Əliyev 2017-ci il 4 avqust tarixində Qax rayonunda keçirilən barama, tütün və fındıq istehsalının inkişafı məsələlərinə dair Respublika Müşavirəsində fındıq bağlarının sahəsinin 80 min hektara çatdırılmasını hədəf olaraq müəyyənləşdirmişdir [18]. Aqrar Subsidiya Şurasının qərarına əsasən, intensiv fındıq bağları salındığı ildən ilk 4 il ərzində 1 hektar üçün 730 manat və sonrakı illərdə 250 manat subsidiya verilir [26]. Eyni zamanda 2022-ci ildə etibarən boş olan Meşə Fondu torpaqlarında, dağlıq və dağətəyi ərazilərdə salınacaq intensiv fındıq bağlarının hər hektarına görə 4400 manat birdəfəlik əkin subsidiyasının ödənilməsi nəzərdə tutulur. Bu isə Azərbaycanda intensiv fındıq bağlarının sahəsinin genişlənəcəyinin və istehsalın artacağının xəbərçisidir.

**Qrafik 6. Azərbaycanda fındıq istehsalı və məhsuldarlığı**




| | 2010 | 2015 | 2016 | 2017 | 2018 | 2019 | 2020 |
|---|---|---|---|---|---|---|---|
| istehsal, min ton | 29.5 | 32.6 | 34.3 | 45.5 | 52.1 | 53.8 | 49.5 |
| məhsuldarlıq, sent/ha | 12.9 | 11.8 | 10.7 | 12.0 | 12.8 | 12.4 | 11 |

***Mənbə:** [5; 24]*

Qrafik 6-dan da göründüyü kimi 2010-cu illə müqayisədə 2020-ci ildə Azərbaycanda fındıq istehsalı 68 faiz artmışdır. 2030-cu ilə kimi yeni salınan intensiv fındıq bağlarının hesabına həm istehsal, həm də məhsuldarlıq göstəricisinin davamlı olaraq artacağını proqnozlaşdıra bilərik.

Araşdırmamız isə göstərir ki, xarici investisiyaları da cəlb etməklə ölkəmizdə fındıq emalının dərinləşdirilməsi vacibdir. Azərbaycanın bu sahədə İtaliyanın "Ferrero" şirkəti [27] ilə əməkdaşlıq imkanlarını araşdırması, hətta bu tip qlobal miqyasda nüfuzlu şirkətləri ölkəmizə cəlb etmək üçün müəyyən güzəştlər paketinin də hazırlanması zəruridir. Nəzərə alaq ki, "Ferrero International S.A." dünya üzrə 107 şirkəti və 32 istehsal müəssisəsini özündə birləşdirir və 170-dən çox ölkədə birbaşa və distribütorlar vasitəsilə satış həyata keçirir. Rusiya-Ukrayna münaqişəsi nəticəsində Avropa Birliyi ölkələri ilə Rusiyanın münasibətlərinin kəskinləşdiyi bir vaxta bu ölkədə istehsal müəssisəsi sahibi olan "Ferrero" şirkəti üçün investisiya baxımından Azərbaycan da cəlbedici ola bilər. Hətta belə şirkətlərin ölkəmizdə fəaliyyəti üçün sənaye məhəlləsinin yaradılması imkanları nəzərdən keçirilə bilər. Amma bütün hallarda fındıqçılığın inkişafı ilə bağlı görülən tədbirlər onu deməyə əsas verir ki, bu məhsulun ixracını artırmaq potensialı var. Qarşıdakı illərdə Azərbaycanda ixrac təşviqinin yenidən verilməsi imkanları olarsa, bu zaman onu qabığı təmizlənmiş meşə fındığına yox, onun emalı nəticəsində alınan məhsullara vermək daha məqsədəuyğun olar.

**Nəticə**

2016-2020-ci illərdə Nazirlər Kabinetinin təsdiqlədiyi siyahı üzrə qeyri-neft məhsullarına 26,5 milyon manat ixrac təşviqi ödənilmişdir. Bundan fındıq ixracatçılarına 2018-ci ildə 1,3 milyon, 2019-cu ildə 4,2 milyon, 2020-ci ildə isə 5,6 milyon manat verilmişdir. Fındığa ödənilən ixrac təşviqinin effektivlik, uyğunluq, səmərəlilik və dayanıqlılıq meyarları əsasında qiymətləndirməsindən aydın olur ki, 2018-2020-ci illərdə fındığın ixrac dəyəri ilə ona verilən təşviqin dəyəri arasında korrelyasiya asılılığı 0,79 olsa da, təşviq üçün ödənilən 11,1 milyon manat vəsait ixracın artmasında rol oynamamışdır. İxrac təşviqinin əsas rolu 2018-ci ildə ixracatçıların xarici bazarlardakı qiymət ucuzlaşması nəticəsində üzləşdikləri zərəri azaltmaq olmuşdur. Nazirlər Kabinetinin 2018-ci il 25 iyun tarixli Qərarı ilə fındığın ixrac təşviqi alacaq malların siyahısına daxil edilməsi büdcə vəsaitlərinin səmərəli istifadəsi, bu məhsulun ixracının və istehsalının artırılması baxımından hədəflərinə tam nail olmamışdır. Bu səbəbdən fındığa verilən ixrac təşviqinin müddətinin 2020-ci ildən sonra uzadılmaması doğru qərardır.

Ümumiyyətlə, 2016-2020-ci illərdə ixracatçılara ödənilən ixrac təşviqinin 42 faizinin qabığı təmizlənmiş meşə fındığı ixracına şamil edilməsi ümumən təşviq mexanizminin nəticələrinə əhəmiyyətli təsir göstərmişdir.

Təhlilimiz göstərir ki, ixrac təşviqi verilmədiyi halda da 2018-2020-ci illərdə Azərbaycanda qeyri-neft sektoru üzrə ən çox ixrac olunan 5 məhsuldan biri yenə fındıq olacaqdı. Araşdırmamızdan aydın olur ki, ölkədə intensiv fındıq bağlarının salınması və ümumilikdə fındıq bağlarının 80 min hektara çatdırılması 2030-cu ilə kimi bu məhsulun ixrac potensialını artıracaqdır. Bunun üçün də növbəti mərhələdə fındığa dövlət büdcəsi hesabına ixrac təşviqinin verilməsi əvəzinə onun emalının dərinləşdirilməsi yönündə dəstək tədbirlərinin həyata keçirilməsi məqsədəuyğundur. Məsələn, həmin vəsait müsabiqə əsasında fındıq emalı müəssisəsi *(fındıq pastası, fındıq yağı və s. istehsalı)* yaradan sahibkarlıq subyektinə dəstək kimi verilsəydi, fındıq istehsalının və ixracının artmasına daha çox təsir edərdi, həmçinin effektivlik, uyğunluq, səmərəlilik, dayanıqlılıq və təsir meyarları əsasında qiymətləndirmədə daha yaxşı nəticə əldə olunardı.

**Ədəbiyyat**


1. Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi. Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarixli Fərmanı ilə təsdiq edilmişdir - http://www.president.az/articles/22110
2. "Azərbaycan Respublikası regionlarının 2019-2023-cü illərdə sosial-iqtisadi inkişafı Dövlət Proqramı". Bakı: 29 yanvar 2019-cu il.
3. Azərbaycan Respublikası regionlarının sosial-iqtisadi inkişafı Dövlət Proqramı (2004-2008-ci illər). Bakı: 11 fevral 2004-cü il.
4. "Azərbaycanın xarici ticarəti -2021". Statistik məcmuə. Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi. Bakı: 2021, 212 s.
5. "Azərbaycanın kənd təsərrüfatı -2021". Statistik məcmuə. Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi. Bakı: 2021, 775 s.
6. Azərbaycanda İxracın və İnvestisiyaların Təşviqi Fondunun illik hesabatı -2017. Bakı: 2018, 52 s.
7. Qeyri-neft məhsullarının ixracının təşviqi ilə bağlı əlavə tədbirlər haqqında Azərbaycan Respublikası Prezidentinin Fərmanı. Bakı: 1 mart 2016-cı il. http://e-qanun.az/framework/32254
8. Qeyri-neft məhsullarının ixracının stimullaşdırılması ilə bağlı əlavə tədbirlər haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı. Bakı: 18 yanvar 2016-cı il. http://e-qanun.az/framework/31869
9. "Qeyri-neft məhsullarının ixracı ilə məşğul olan şəxslərə ixrac təşviqinin ödənilməsi Qaydası"nın, "İxrac təşviqi şamil olunacaq qeyri-neft məhsullarının xarici iqtisadi fəaliyyətin mal nomenklaturası üzrə Siyahısı"nın və "Məhsulların növündən asılı olaraq ixrac təşviqinin baza məbləğinə tətbiq olunacaq Əmsallar"ın təsdiq edilməsi haqqında Azərbaycan Respublikası Nazirlər Kabinetinin Qərarı. Bakı: 6 oktyabr 2016-cı il. http://e-qanun.az/framework/33870
10. Hüseyn R.Z. Aqrar sahədə rəqabətqabiliyyətli məhsul istehsalı: qloballaşmanın çağırışları və inkişaf imkanları, Bakı: "Avropa" Nəşriyyatı, 2018, 408 s.
11. Hüseyn R.Z., Hüseynov R.F. Koronavirus pandemiyasının kənd təsərrüfatı məhsulları ixracına təsirinin qiymətləndirilməsi. "Kənd təsərrüfatının iqtisadiyyatı" elmi praktik jurnalı, 2021, №1 (35) Agricultural Economics. səh.16-27. https://agroeconomics.az/az/article/135/koronavi-rus-pandemi-yasinin-kend-teserrufati-mehs/
12. Hüseyn R.Z., Xubanov C.X. Azərbaycanın ÜTT-yə üzvlük prosesində ixracı subsidiyalaşdırmamaq barədə götürdüyü öhdəlik və onun ölkənin kənd təsərrüfatı məhsulları istehsalçılarına təsiri. Elmi-Tədqiqat Kənd Təsərrüfatının İqtisadiyyatı və Təşkili İnstitutunun Elmi əsərləri № 5, Bakı, 2008, səh. 66-70.
13. Rusiya fındıq bazarının marketinq araşdırması. Yekun hesabat. "Qabus" Tədqiqat və Məsləhət Şirkəti. Bakı: 2021.
14. Better Criteria for Better Evaluation Revised Evaluation Criteria Definitions and Principles for Use OECD/DAC Network on Development Evaluation. OECD, 2019. https://www.oecd.org/dac/evaluation/revised-evaluation-criteria-dec-2019.pdf
15. Glossary of Key Terms in Evaluatıon and Results Based Management. OECD PUBLICATIONS, PARIS, FRANCE, 2002. https://www.oecd.org/dac/evaluation/2754804.pdf

16. Hamza Khlilov, Namig Shalbuzov, Ramil Huseyn. Key Areas for Agriculture and Rural Development through International Cooperation and Analysis of Product Value Chain. Korea Rural Economic Institute. Research Materials-2 | 2018. 12. |
17. Namig Shalbuzov, Firdovsi Fikretzade and Ramil Huseyn. The International Competitiveness of Azerbaijani fruit and vegetable products. Studies in Agricultural Economics 122 (2020) 51-55, Budapest, Hungary.

**İnternet mənbələri:**

18. Azərbaycan Respublikası Prezidentinin rəsmi saytı - https://president.az/articles/24874
19. Azərbaycan Respublikasının Nazirlər Kabinetinin rəsmi saytı - https://cabmin.gov.az/
20. Azərbaycan Respublikasının İqtisadiyyat Nazirliyi - http://economy.gov.az
21. Azərbaycan Respublikasının Dövlət Statistika Komitəsi - https://www.stat.gov.az/source/trade/
22. Azərbaycan Respublikasının Dövlət Gömrük Komitəsi - http://customs.gov.az/az/faydali/gomruk-statistikasi/
23. International Trade Centre - www.trademap.org
24. Food and Agriculture Organization of the United Nations - http://www.fao.org/statistics/en/
25. http://www.azpromo.az
26. https://www.agro.gov.az/az/news/aqrar-subsidiya-surasi-2022-ci-il-uecuen-subsidiya-emsallarini-aciqladi
27. https://www.ferrero.com/the-ferrero-group/business/key-figures

*Dr.* R. Huseyn
Center for Analysis of Economic Reforms and Communication

**Evaluation of the results of measures implemented to export of peeled Hazelnut in Azerbaijan**

*Abstract*

*Azerbaijan has started to provide export subsidy for peeled hazelnuts since 2018, and 11.1 million manats have been paid from the state budget for this purpose over three years. This article evaluates the export subsidy paid for hazelnuts in Azerbaijan based on the criteria of relevance, effectiveness, efficiency, impact and sustainability and analyzes the impact of this measures on hazelnut production and export. It was concluded that hazelnuts are a competitive product of Azerbaijan and would be one of the most exported products in the non-oil sector in 2018-2020, even if it is not subsidized to export. At the same time, the role of hazelnuts in increasing the export of non-oil products was evaluated and relevant proposals/suggestions were made to expand its exports.*

***Keywords:*** *non-oil exports, export subsidy, agriculture, hazelnuts, evaluatıon.*

*Д.э.н.* Р. Гусейн
Центр анализа экономических реформ и коммуникаций

**Оценка результатов мероприятий по содействию экспорту очищенного фундука из Азербайджана**

*Резюме*

*Азербайджан начал предоставлять экспортную субсидию на очищенный фундук с 2018 года, и за три года из государственного бюджета на эти цели было выплачено 11,1 миллиона манатов. В этой статье оценивается экспортная субсидия, выплачиваемая за фундук в Азербайджане, на основе критериев актуальности, эффективности, результативности, воздействия и устойчивости, а также анализируется влияние этих мер на производство и экспорт фундука. Сделан вывод, что фундук является конкурентоспособным товаром Азербайджана и был бы одним из самых экспортируемых товаров в ненефтяном секторе в 2018-2020 годах, даже если его экспорт не субсидировался. При этом была оценена роль фундука в увеличении экспорта ненефтяной продукции и внесены соответствующие предложения по расширению его экспорта.*

***Ключевые слова:*** *ненефтяной экспорт, экспортная субсидия, сельское хозяйство, фундук, оценка.*